

**Mərhəmətli, Rəhimli Allahın adı ilə.**

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərrindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**"Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün"[1].**

**"Ey insanlar! Sizi tək bir şəxsdən** (Adəmdən) **xəlq edən, ondan zövcəsini** (Həvvanı) **yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun.** (Adı ilə) **Bir-birinizdən** (cürbəcür şeylər) **istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir"[2].**

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!** (Əgər belə etsəniz) **Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə** (Cənnətə) **nail olar"[3].**

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bir bidət, hər bir bidət isə zəlalətdir (sapıqlıqdır), hər bir zəlalət (sapıqlıq) isə oddadır.

Əziz Müsəlman qardaş və bacılar! Söhbət açacağımız bu mövzu hər bir müsəlman üçün həyatda mühüm olan bir mövzudur və hər bir

---

[1] Ali-İmran, 102
[2] ən-Nisa, 1
[3] əl-Əhzab, 70-71

müsəlmanın həyatda ikən onu tələb etməsi vacibdir. Onsuz həyat sıxıntılı, tənəzzülə uğramış, onsuz isə insanlar dəyərsizdir. Var dövlətə, mal-mülkə sahib olsa belə onu itirən həyatda hər bir şeyini itirmişdir. Onu qazanan isə həyatda  çox şey qazanmış olar, hətta var-dövləti əlindən çıxsa belə.

Müsəlman qardaş və bacılar! Nəzərinizə çatdırmaq istədiyimiz bu mövzu, iman və təqva mözusudur. Bu mövzumuz Allaha, mələklərə, ölümə və ölümdən sonrakı anlar, Qiyamət gününün dəhşətli anları ,əməl dəftərlərinin insanlara verilməsi, əməllərin tərəzidə çəkilməsi, sirat körpüsündən keçmək, cənnəti və cəhənnəm və s. insana axirəti xatırladan, imanın güclənməsinə kömək edən ixtisar olunmuş mövzular haqqındadır. Bunlara həqiqi inanan kimsə Allahın Qurani-Kərimdə və Peyğəmbərin hədislərində söylədiyi əmrləri yerinə yetirir, qadağan edilənlərdən isə çəkinir. Allahın insanlardan tələb etdiyi də elə məhz  budur. Allah təalə buyurur:

**“Biz sizdən əvvəl Kitab verilənlərə də, sizə də Allahdan qorxmanızı buyurduq”[4].**

Allaha və axirət gününə şək-şübhə ilə inanan və Allahın buyruqlarına səhlənkarcasına yanaşanlar isə bu əmrləri və qadağanları lazımınca yerinə yetirmirlər və bu da çox vaxt iki böyük amildən irəli gəlir:

1. Dini elmin yoxluğu və ya azlığı;
2. Bu elmə əməl olunmaması.

Bu iki amil imanın zəifliyindən şaxalənən iki budaqdır. Biz isə gücümüz çatdığı qədər özümüzdən və başqalarından bu iki amili qaldırmağa çalışacağıq. İnsanın qəlbində olan bu iman duyğuları Allah və Peyğəmbərinə itaət etməklə bərpa olur. Asi olmaqla  isə zəifləyir və tamamilə yox olub gedə bilir və ola bilsin ki, insanın imanı azalsın ,amma özü də bunu hiss etməsin. Bunun səbəbləri isə  ətrafındaki zəif imanlı insanları görüb özünün xeyir üzərində olmasını iddia etməsidir. O, fikirləşir ki, ətrafındakıların imanı zəifdir, amma (Maşaallah) özünün imanı güclüdür. Onun özü bir-iki namazı məsciddə qılar, amma

[4] Ən-Nisa,131

insanların əksəriyyəti qılmazlar. Bu düşüncələr ona qürur və özünü bəyənmək kimi fikirlər gətirir. Şeytan isə ona gördüyü xeyirli işlərdən batil faydalar çıxartmaqda yardım edir. Məsələn, fəcr namazına məscidə iqamədən əvvəl gəlir və fikirləşir ki, imanı güclüdür. Çünki insanlar fəcr namazına ya yatıb qalarlar, ya da çox az gələrlər. Bu hal çox vaxt günahlara biganə yanaşan insanlarda olur. Amma bu söhbət eşidilib əməl edilməzsə, fayda verməz. Necə ki, Allah Subhanə və Təalə Qurani-Kərimdə buyurur:

**"O kəslər ki, sözə qulaq asıb onun ən yaxşısına tabe olurlar, onlar Allahın doğru yola yönəltdiyi şəxslərdir. Ağıl sahibləri də məhz onlardır"[5].**

Müsəlman qardaş və bacılar! İmanın zəifliyindən dolayı insanda özünü biruzə verən bir çox əlamətlər müşahidə olunur, bu əlamətlərdən biri də Allahın insanlara nazil etdiyi dünya və axirət xoşbəxtliyini özündə cəm edən Qurani-Kərimi oxumamaq və ya oxuyub düşünməməkdir. Həmçinin imanın zəifliyindəndir ki, İmamın arxasında namaz qılasan, amma imamın nə oxuduğunu dinləməyəsən. Ola bilsin dua edirsən, əzabdan Allah Təaləyə sığınırsan, amma qəlbin dünya barəsində fikirləşir. Açıq aydın ayətlər təsir etmir. Bu yerdə möminlər barəsində Allah Təalə buyurur:

**"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar..."[6]**

Ey insan! Əgər qəlbin titrəmirsə bil ki, bu imanın zəifliyindəndir.
Allah Təalə başqa bir ayədə buyurur:

**"Məgər o bilmir ki, qəbirlərdə olanlar çıxardılacağı və kökslərdə olanlar aşkar ediləcəyi zaman – məhz o gün Rəbbi onlardan xəbərdar olacaqdır?"[7]**

Düşündüyün günahlar, o şeylər ki, öz aləmində onları gizlədirdin, asi olub, günah işlədirdin və elə zənn edirdin ki, Allah səni görmür.

---

[5] əz-Zumər,18
[6] Əl-Ənfal,2
[7] Əl-Adiyat, 9-11

Allah Təalə buyurur:

**“O gün siz *məhşərə* gətiriləcəksiniz və heç bir sirriniz gizlədilməyəcəkdir”[8].**

Əgər imanın güc-qüvvətini yoxlamaq istəyirsənsə Qurana qayıt. Onu oxuyanda təsirlənirsənmi? İmamın arxasında namaz qılanda fikrini yayındırmadan, qorxu ilə namaz qılırsanmı, nə oxuduğunu fikirləşirsənmi? Qorxu hissləri keçirirsənmi? Vallahi əgər bu Quran dağlara ensəydi dağlar parça-parça olardı. Necə ki, Allah Təalə başqa bir ayədə buyurur:

**“Əgər Biz bu Quranı dağa nazil etsəydik, sən onun Allahın qorxusundan boyun əyib parça-parça olduğunu görərdin. Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə, fikirləşələr.”[9]**

Amma nə olub bu qəlbə ki, təsirlənmir? Səbəb nədir? Əlbəttə günahlar. Allah Təalə buyurur:

**“Xeyr! Onların qəlbini qazandıqları *günahlar* bürümüşdür.”[10]**

Bir çox insanlar vardır ki, Quran oxuyurlar, amma onun əzəmətini hiss etmirlər. Elə bil ki, qəzet oxuyurlar, və yaxud hər hansısa bir qissəni eşidəndə təsirlənmirlər. Əgər düşmən barəsində eşitsəydilər qorxardılar, amma Allahın əzabı barəsində eşidəndə qorxmurlar.

Allah Təalə ibrət alıb düşünmək üçün nazil etdiyi başqa bir ayədə isə belə buyurur:

**“Allah Sözün ən gözəlini – *ayələri* bir-birinə bənzəyən və təkrarlanan Kitab kimi nazil etdi. Rəbbindən qorxanların ondan dəriləri ürpəşər. Sonra isə Allahı yad etməklə dəriləri və qəlbləri yumşalır. Bu, Allahın hidayətidir. Onunla istədiyini doğru yola yönəldir. Allahın zəlalətə saldığı şəxsə isə yol göstərən olmaz.”[11]**

---

[8] Əl-Həqqa, 18
[9] Əl-Həşr, 21
[10] əl-Mutaffifin,14
[11] Əz-Zumər,23

Həqiqətən mömінin halı belə də olur. Həqiqətən mömin belə ayələri eşidəndə həyacan keçirir, qəlbi titrəyir və bu ayətlərə tab gətirə bilmir, qorxur və bir az sonra başqa bir ayəni eşitdikdə:

**"Həqiqətən, müttəqilər üçün nicat yeri vardır"[12].**

Qəlbi yumşalır, sakitləşir Allah Təalədən onun rəhmətini istəyir. Allah Təalə buyurur:

**"Məgər onlar Quran haqqında düşünmürlərmi? Yoxsa qəlbləri qıfıllıdır?"[13]**

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) gecə namazına qalxardı və uzun surələr oxuyardı. Əzab ayətlərinə çatanda əzabdan Allaha sığınardı. Rəhmət ayətlərinə çatanda onların fəzilətini Allahdan istəyərdi. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) ayətlərə belə yanaşardı. Amma bizim bir çoxumuzdan soruşsan ki, imam işa namazında hansı surəni oxudu? Bilməz. Sübhənallah! Nə vaxt özünlə tək tənha qalıb öz nəfsini hesaba çəkdin, günahlarını xatırladın, Quran oxudun, Allahı zikr etdin və gözün yaşardı?!

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) Allahı təklikdə anaraq göz yaşı axıdan kimsə barəsində buyurur:

*"Qiyamət günü heç bir kölgə olmadığı zaman yeddi sinif insanı Allah Təala Ərşin kölgəsi altında kölgələndirəcək. Həmin siniflərdən biri də Allahı tək tənha olaraq zikr edib göz yaşı axıdan kimsədir."*[14]

Ey Allahın qulu! Əgər biz bu dərəcəyə çatmamışıqsa bil ki, bunlar hamısı imanın zəifliyinə dəlalət edir. Həmçinin imanın zəifliyinə dəlalət edən əlamətlərdən biri də insanların çoxlu günahlara yol verməsi və günahlara biganə yanaşmasıdır. Hər dəfə günah işləyəndə deyir ki, "kiçik günahdır". Günahları öz gözündə kiçildir. Hər dəfə günah işlədikdə deyir ki, "Əlhəmdulillah, camaatla birlikdə namaz qılmışam". Yaxşılıqlar pislikləri yuyub aparır. Evə girib televizoru açıb əxlaqsız verlişlərə baxır, musiqiyə qulaq asır, çölə çıxanda yarıçılpaq, dar paltar geyib özünü yad

---

[12] Nəbə, 31

[13] Muhammməd,24

[14] Buxari

kişilərə göstərir və öz-özünə deyir: "Bu mənə heç bir zərər toxundurmaz". Sonra oturduğu məclislərdə insanların qeybətini edir. İnsanların namusu barədə danışır. Qeybət və lağ-lağa etmədən məclislər onun üçün can sıxıcı olur. Günahların kiçiyinə, böyüyünə məhəl qoymur.

İbn Qeyyum Əl-Cövzi belə buyurur:

"Çox qığılcımlar var ki, onlardan böyük bir odlar törəmişdir."

Ey Allahın qulu! Elədiyin bütün günahların hamısı kiçik və böyüklüyündən asılı olmayaraq mələklər tərəfindən əməl dəftərinə qeyd olunur. Adi bir baxışın buraxılmır. Qəzet-jurnalı açıb oxuyanda ordakı qadına baxıb ləzzət alanda, və ya olduğun məclislərin birində oturub qeybətə qulaq asanda, öz nəfsini müdafiə etmək üçün belə deyirdin: "Kiçik bir şeydir, mən ki, danışmıram".

Bir gün ehtiyaclarından dolayı bazara çıxanda satıcı bir qadına rastlaşıb onunla alış-veriş edəndə başladın onu danışdırmağa, güldürməyə və o zaman "heç nə olmaz, zərurətdir" deyirdin. Ay yazıq insan, məgər sən bilmirsən ki, mələklər sənin bütün günahlarını yazıb əməl dəftərində qeydə alır. Necə ki, Allah Təalə buyurur:

***"Hər kəsin* kitabı *qarşısına* qoyulacaq və sən günahkarların orada *yazılmış* olanlardan qorxduqlarını görəcəksən. Onlar deyəcəklər: "Vay halımıza! Bu necə bir kitab imiş! O nə bir kiçik, nə də bir böyük günahı buraxmadan hamısını sayıb yazmışdır!" Onlar etdikləri əməlləri öz qarşılarında görəcəklər. Rəbbin heç kəsə haqsızlıq etməz!"**[15]

İnsanın imanı zəif olanda artıq kiçik günahlara belə fikir vermir. Hətta o dərəcəyə çatır ki, artıq böyük günahlar onun üçün adiləşir. Allah Təalədən böyük günahlara düşməkdən afiyət istəyir, qeybət etməyə, valideynlərə ağ olmağa və digər günahlar etməyə başlayır. Sonra isə günah edəndə açıq aşkar edir. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) bu barədə buyurur:

***"Bütün ümmətim bağışlanacaq, amma günahları açıq aşkar edənlərdən başqa*[16] *"***. İnsanların gözü qabağında haramlara yol verir,

[15] əl-Kəhf, 49

[16] Buxari, Müslim

əxlaqsız işlər görür və etdikləri ilə fəxr edib belə deyir: "Filan yerə getdim, belə belə işlər gördüm". Həmçinin imanın zəifliyi əlamətlərindəndir ki, insan başqalarına məhəl qoymur. Əgər müsəlmanların rayonlarda, şəhərlərdə olan çətin vəziyyəti barəsində onunla söhbət etsən deyir: "Mənə nə var". Yalnız və yalnız öz nəfsini fikirləşir. Bu yerdə Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) buyurur:

*"Sizdən biri öz nəfsinə istədiyini öz qardaşına istəməyincə kamil iman etmiş olmaz".*[17]

Həmçinin imanın zəiflik əlamətlərindən biri də insanın ibadətdə tənbəl olmasıdır. Əvvəl hidayətə gəldiyi vaxtlarda birinci səfdə namaz qılardı. Amma indi nə olub sənə ey insan, axırıncı səflərdə namaz qılırsan. Məscidə iqamədən sonra gedirsən.

Sələfilərdən olan Süleyman əd–Dərani belə deyərdi: "Insan etdiyi günaha görə camaat namazından məhrum olur"[18].

Ey insan! öz nəfsini hesaba çək, otur yaxşı-yaxşı fikirləş. Sənə nə olub ki, ancaq axırıncı rükətlərə gəlib çatırsan, və yaxud heç gəlmirsən yatırsan. Bununla belə də zənn edirsən ki, sən xeyir üzərindəsən.

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) buyurur:

*"O qövümlər ki, birinci səflərə gecikməyə başlayarlar və gecikərlər və bu iş üzərində davam edərlər. Hətta o dərəcəyə gəlib çatarlar ki, Allah Təalə onları öz fəzilətindən gecikdirər, uzaqlaşdırar"*[19].

Yazıq insan bilmir ki, ibadətə tənbəl yanaşmaq nifaqın əlamətlərindəndir. Necə ki, Allah Təalə Qurani Kərimdə buyurur:

**"Onlar namaza durarkən könülsüz qalxar, özlərini camaata göstərər və Allahı olduqca az yad edərlər"**[20].

İlk hidayətə gəldiyi vaxtlarda cibində zikr kitabçası gəzdirərdi. Səhər-axşam zikrlərini edərdi , amma indi nə olub sənə ey insan, səhər-axşam zikrlərini yaddan çıxarmısan? Əvvəllər gündəlik açıb Quran

[17] Buxari
[18] Məqrizi, "Muxtəsərul qiyamul-leyl"
[19] Muslim
[20] ən-Nisa, 142

oxuyardın. Vaxt var idi ki, gündüzlər duha namazı, iki, dörd və ya daha çox gecə namazı qılardın. Sənə belə nə oldu? Gecə namazı Ramazandan başqa yada düşmür. O da əgər qılsan. Əvvəllər birinci və dördüncü günləri oruc tutardın, amma indi bir gün də belə olsun oruc tutmursan.

Həsənul-Basri bu yerdə gözəl buyurur: "Insan etdiyi günaha görə gecə namazından və gündüz tutduğu oruclardan məhrum olur".[21]

Allah Təaləni zikr etmək haradadır? Sənə nə oldu ki, belə dəyişdin? Bunların hamısı imanın zəifliyindəndir. Amma sən bunları hiss etmirsən. Ey insan! səni nə dəyişdirdi? Dünyamı, yoxsa qadınlarmı?

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) Müslimin rəvayət etdiyi bir hədisində belə buyurur:

*"Bəni İsraili hər şeydən əvvəl yolundan azdıran qadınlar oldu. Dünyanın və qadınların fitnəsindən, şərrindən qorxun. Özünüzü qoruyun."*[22]

Allah Təalə buyurur:

**"Ey iman gətirənlər! Nə mallarınız, nə də övladlarınız sizi Allahın zikrindən yayındırmasın! Bunu edənlər ziyana uğrayanlardır."**[23]

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) belə buyurur: *"Ümmətindən elə qövmlər olacaq ki, zinanı, ipəyi, içkini, musiqini halal görəcəklər"*[24].

Yoxsa oturub durduğun dostlarmı səni bu qədər dəyişdirdi? Ən doğrusunu Allah bilir.

Ey insan! Öz nəfsini hesaba çəkməyən onun əziyyətini çəkər. Nəfs itaətsizliyi, tənbəlliyi və rahatlığı çox sevir. Nəfs itaəti sevmədiyinə görə çox vaxt etdiyi ibadətdə naqislik olur. Ona görə də gözün həmişə onun üzərində olsun, onu həmişə yoxla, sorğu-suala çək. Əgər bir naqislik tapsan, onda nəfsinə caiz olan bir şəkildə dərs ver ki, bir daha buraxdığı xətalara qayıtmasın.

---

[21] Məqrizi, "Muxtəsərul qiyamu-leyl"

[22] Muslim

[23] Əl-Munafiqun, 9

[24] Buxari

Ömər (*Allah ondan razı olsun)* buyurur: "Axirətdə sorğu-suala çəkilməzdən əvvəl nəfslərinizi sorğu-suala çəkin. Kim dünyada ikən öz nəfsini hesaba çəkərsə, axirətdə sorğu-sualı azalar".

Həmçinin imanın zəiflik əlamətlərindəndir ki, insan pis işlərlə tez-tez rastlaşır. Amma bunlar ona heç təsir etmir, heç halı dəyişmir, sıxılmır. Allah Təalə insanları günahlardan çəkindirib onlara doğru yol göstərənlər barəsində buyurur:

**"Siz insanlar arasında üzə çıxarılmış ən xeyirli ümmətsiniz. Siz yaxşı işlər görməyi əmr edir, pis əməlləri qadağan edir və Allaha iman gətirirsiniz".[25]**

Pisliyi inkar etmək imandandır. Kim öz imanının miqdarını bilmək istəyirsə özündən və başqalarından pis əməlləri uzaqlaşdırıb, özünü və başqalarını doğru yola yönəltməsinin dərəcəsinə baxsn. Əvvəllər televizorda pisliklər görəndə televizoru söndürərdi. Birini qeybət edən, ara vurduğunu görəndə onlara nəsihət edərdi. Əgər bunu bacarmazdısa həmin məclisi tərk edərdi. Amma indi onun özü harama baxır, ancaq fikir vermir. Pis məclislərdə oturur, heç halı dəyişmir, hətta belə məclislərdən durub çıxıb getmir. Çünki onun artıq imanı zəifləyib.

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) imanın ən zəifi barədə belə buyurmuşdu:

*"Sizdən kimsə bir münkər (pis əməl, qadağa) görərsə onu əli ilə dəyişdirsin. Əgər gücü çatmazsa dili ilə, bunu da bacarmadıqda qəlbi ilə (dəyişdirsin). Bu isə imanın ən zəif mərtəbəsidir"[26].*

Bilrsinizmi Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*)in bu sözü kimə aiddir? O kimsələrə ki, onlar hər hansısa bir məclisdə günah söhbətlərə rast gələrlər və bu günahları əli və ya dili ilə dəyişdirə bilməyib, qəlblərində olan sıxıntıdan dolayı bu məclisi tərk edənlərə. Budur imanın ən zəifi. Yaxşı, onda orada oturub münkərə qulaq asan insana bəs nə deyək?! Öz ayağı ilə belə məclislərə gedənlərə nə deyək?! Bu işi özləri görənlərə nə deyək?! Öz nəfslərinə uyub, fitnələri qızışdırıb,

---

[25] Ali-İmran, 110
[26] Muslim

sonra da bu əməllərinə Quran və Sünnə donu geyindirənlərə bəs nə deyək?! Allah danışılan hər bir sözün, əslinin ixlasa və ya nəfsə qulluq etdiyini bilir. Qiyamət günü gələndə, Allah Təalə buyurur:

**"De: "Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər haqqında ki, onların dünya həyatındakı səy- ləri boşa çıxmışdır. Çünki onlar özlüyündə yaxşı işlər gördükləri gü- manında idilər."**[27]

Sələfilərdən bəziləri Allah təalənin bu ayəsini eşidəndə ağlayardı.

**"Lakin Allahdan onlara güman etmədikləri** ***bir əzab*** **düçar olacaqdır."**[28]

Müsəlman bacı və qardaşlarım, qəlbimizdəki imanı necə dirildə, və yaxud necə müalicə edə bilərik? Birinci biz bilməliyik ki, bu həyat, bu ömür qısa, ləzzətləri keçici olan, lakin insan nəfsinə gözəl görünən bir ömürdür. Necə ki, Allah Təala buyurur:

**"Qadınların, uşaqların, yığın-yığın qızıl-gümüşün, yaxşı cins at- ların, mal-qaranın və əkin yerlərinin verdiyi zövqlərə olan istək insanların gözünə gözəl göstərilmişdir. Bunlar, dünya həyatının keçici zövqüdür, gözəl qayıdış yeri isə Allah dərgahındadır."**[29]

Əbu Dərda (*Allah ondan razı olsun)* ölüm ayağında ikən ağlayaraq yanındakılara belə deyir:

"Bu anı, bu saatı, bu günü üçün əməl edən bir kişi varmı?"

Əbu Hüreyrə (*Allah ondan razı olsun)*, o kimsə ki, günlərini Allaha ibadətdə keçirərdi, elm tələbəsi ölməzdən əvvəl ağlayardı. Soruşardılar: "Ey Əbu Hureyrə! səni ağladan nədir?" O da belə cavab verərdi: "Səfərin uzunluğu, azuqənin azlığı, imanın zəifliyi və sirat üzərindən keçərkən ora düşmək qorxusu". O, ölümündən qabaq bu sözləri deyərək ağlayırdı. Amma biz nə deyirik? Biz ki, günlərimizi günahlarla keçiririk. Əgər bizdən biri o anları lazımınca fikirləşsə Vallahi gözü ilə harama baxa bilməz, televizoru aça bilməz. Əgər orada əxlaqsız verilişlər varsa, Vallahi

---

[27] Kəhf, 103-104
[28] əz-Zumər, 47
[29] Ali-imran, 14

artıq münkər məclislərinə gedə bilməz (əgər o anları lazımınca haqqı ilə fikirləşərsə). Hər bir kəs ölümə məhkumdur. Fərqi yoxdur, İstər varlı, kasıb, gözəl, çirkin, güclü, zəif, böyük, kiçik, alim və cahil olsun. Ölüm hər bir bəşərin sonudur. Allah Təalə buyurur:

**“Hər bir kəs ölümü dadacaqdır. Lakin Qiyamət günü mükafatlarınız sizə tam veriləcəkdir. Kim Oddan uzaqlaşdırılıb, Cənnətə daxil edilərsə, o uğur qazanmış olar. Dünya həyatı isə aldadıcı ləzzətdən başqa bir şey deyildir.”**[30]

Əgər Allah kiməsə əbədi həyat vermək istəsəydi, o da sevimli peyğəmbəri Məhəmməd (*ona Allahın salavatı və salamı olsun*) olardı. Amma o da öldü. Allah Təalə buyurur:

**“Əslində, sən də öləcəksən, onlar da öləcəklər!”**[31]

Əziz Müsəlman bacı və qardaşlar! Hər bir insan ölüm həqiqəti ilə üzləşir və ölümdən qaçmaq mümükün deyil. Allah Təalə həmin an barədə buyurur:

**“ Xeyr, o *ruh* körpücük sümüklərinə yetişəcəyi zaman; “Ovsunu kim oxuyacaq?”– deyiləcəkdir. *Can verən adam dünya həyatından* ayrıldığını yəqin edəcəyi və baldır baldıra dolaşacağı zaman – o gün *hər kəs* Rəbbinin hüzuruna gətiriləcəkdir.”**[32]

Ey insan, xəyalına gətir ki, Allah Təalə sənin həmin halın barəsində xəbər verir. Ölüm yatağı ola bilsin ki, ətrafında atan, anan, uşaqların və zövcən duracaq. Sənin bu halına ağlayacaqlar. Ola bilsin ki, kiçik oğlun və qızın səni qucaqlayaraq “Ey ata! sənə nə olub, sənə nə olub ki, cavab vermirsən? Ey ana! sənə nə olub ki, danışmırsan?” deyəcəklər. Sən isə öz əl-qoluna baxacaqsan, artıq onlara nə olub ki, onlar hərəkətdən düşür, soyuyur. Ata soruşacaq ki, kim mənim övladıma şəfa verə bilər? Övlad deyəcək ki, kim mənim valideynlərimi sağalda bilər? Qadın deyəcək ki, kim mənim ərimi geri qaytara bilər? Allah Təalə bu anı vəsf edərək belə buyurur:

---

[30] Ali-İmran, 185

[31] Əz-Zumər, 30

[32] əl-Qiyamət, 26-30

**“*Can* boğaza yetişdiyi zaman – həmin an siz *can verən adama* baxırsınız. Biz ona sizdən daha yaxın oluruq, siz isə *bunu* görmürsünüz. Madam ki siz *iddianıza görə* haqq-hesab olunmayacaqsınız və doğru danışanlarsınız, onda, o canı geri qaytarın?”**[33]

Bu anda Allah can verən kimsənin duyğularını Qurani Kərimdə belə canlandırır:

**"Can üstə olan kimsə ayrılıq dəminin gəlib çatacağını anlayacaq.”**[34]

O, artıq bilir ki, bu dünyadan ayrılır, amma indiyə qədər arzularına çatmayıb, oğul uşağını boya başa çatdırmayıb. Bu vaxta qədər hələ evini tikib qurtarmayıb, özünə maşın almayıb, və ya evlənməyə hazırlaşırdı, və ya övlad gözləyirdi. Amma onun həyata keçirmək istədiyi arzuları ölümlə qarşılaşdı. Allah Təalə buyurur:

**“Can üstə olan kimsə ayrılııq dəminin gəlib çatacağını anlayacaq və ölüm qorxusundan ayaqları bir-birinə dolaşacaq.**”[35]

Allah Təalə başqa ayədə buyurur:

**“And olsun *kafirlərin canını* zorla alanlara! And olsun *möminlərin canını* rahatlıqla alanlara!”**[36]

Ölüm mələyi isə bu zaman ruhu çıxarmağa başlayır. Amma sən tapşırılan əmanətləri bu zamana qədər öz sahiblərinə verməmisən. Bu vaxta qədər Allah və insanların sənin üzərində haqqları var və onları qaytarmamısan. Namaz qılmamaqdan, oruc tutmamaqdan, zəkat verməməkən, insanlara əziyyət verməkdən, sübh namazına yatıb qalmaqdan və başqa günahlardan hələ də tövbə etməmisən. Məhz buna görə də sən sonra peşman olacaqsan. Amma bu peşmançılıq sənə fayda verməyəcək. Allah Təalə ölüm anında peşman olanların dilindən belə buyurur:

**“Nəhayət, onlardan birinə ölüm gəldiyi zaman deyər: “Ey Rəbbim! Məni geri qaytar. Bəlkə, tərk etdiyim yaxşı əməlləri *indi* edəm”. Xeyr!**

---

[33] əl-Vaqiə, 83-8

[34] əl-Qiyamət, 28

[35] əl-Qiyamət, 28-29

[36] ən-Naziat, 1-2

**Onun bu dedikləri ancaq *boş* bir sözdür. Onların arxasında diriləcəkləri günə qədər bərzəx vardır."**[37]

Ey insan, lakin artıq çox gecdir. Çünki o gün aparılacağın yer artıq Allah Təalənin hüzuru olacaq. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) buyurur:

*"Ləzzətləri parça-parça edən ölümü çox yada salın"*[38].

Ölümü çox yada sal ey insan! Dünyanın hər bəzəyi, ölümü xatırlamaqdan səni yayındırmasın. Ey Allahın qulu, bil ki, bu dünya Allah yanında heç bir dəyəri yoxdur. Necə ki, Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) buyurur:

*"Əgər dünyanın Allah yanında ağcaqanadın qanadı qədər qiyməti olsaydı, kafirə bir qurtum belə su içirtməzdi"*[39].

Sənin milyonların Allahın razı qaldığı yerlərə xərclənmirsə, axirətdə sənə heç bir fayda verməyəcək. Vallahi bütün mal –dövlət, oğul-uşaq hamısı məhv olub gedir. Bu dünyada hər bir şey fanidir. Amma sənə qiyamət günü fayda verən isə sənin dünyada ikən etdiyin yaxşı əməllərin olacaq. Dünyaya aldanıb, axirəti unutmamaq üçün ölümün şiddətini, qəbrin zülmətini və tənhalığını, Qiyamətin dəhşətini və Allah qarşısında sorğu – sual üçün duracağını fikirləş. İnsanın ruhu bədənindən ayrılıqdan sonra dünya ilə onun əlaqələri kəsilir. Artıq insan qəbir mənzilinə yola düşür. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) Buxarinin rəvayət etdiyi bir hədisdə buyurur.

*"İnsanlar cənazəni qəbrə basdırmaq üçün aparanda cənazə danışır. Onun səsini insan və cindən başqa hamı eşidir .Əgər ölən insan salehlərdəndirsə belə deyir: "Məni basdırılacağım qəbrə tez çatdırın". Yox, əgər bu insan pis əməl sahiblərindəndirsə, özünü qəsd edərək belə deyər: "Vay olsun onun halına! onu hara aparırsınız". Cənazənin bu səsini insandan başqa hamı eşidir".*[40]

---

[37] əl-Muminun, 99-100.

[38] Sünən İbn Macə, Sünən ət-Tirmizi.

[39] Sünən ət-Tirmizi, 2320. Sünən İbn Macə, 4110.

[40] Buxari.

Ey insan! Qəbir səni dünyadan Axirətə keçmək üçün bir qapıdır və bu qapının nə vaxtsa sənin də üzünə açılacağını unutma. Bir gün bu dünyaya gəldiyin kimi, bir gün də bu dünyadan gedəcəksən və qəbr sənin üçün əməllərinin müqabilində ya Cənnət bağçalarından bir bağça, ya da Cəhənnəm quyularından bir quyu olacaq. Unutma ki, Allahın insanlara vəd etdiyi günə, Qiyamət gününə kimi orada qalacaqsan.

Ey Allahın qulu! Yəqin ki, Allahın bizə vəd etdiyi gün, Qiyamət günü səndən gizli deyil. Bu Allahın insanlara verdiyi bir vəddir ki, Allah heç vaxt öz vədinə xilaf çıxmaz. O böyük gündə Allah İsrafilə surun çalmasını əmr edəcək və qəbirlərdə olan insanlar sorğu–sual üçün qəbirlərindən çıxarılacaqlar. Allah Təalə buyurur:

**"Sur ikinci dəfə üfürülən kimi onlar dərhal qəbirlərdən çıxıb Rəbbinə tərəf axışacaqlar."**[41]

Allah bütün insanları və heyvanları öz ruhlarına qovuşduracaq və bu zaman insan qəbrindən çıxanda ətrafına baxıb görəcək ki, göylər parça-parça olub, ayağının altında yer silkələnir, böyük dağlar didilmiş yun kimi olub, ulduzlar tökülür, dənizlər qaynayır və insan bütün bu dəhşətləri görüb sərxoş hala düşəcəkdir. Allah Təalə Qiyamət gününü Qurani Kərimdə belə vəsf edir.

**"Günəş sarınacağı zaman, ulduzlar soluxub sönəcəyi zaman, dağlar hərəkətə gətiriləcəyi zaman, boğaz dəvələr başlı-başına qalacaqları zaman, vəhşi heyvanlar bir yerə toplanılacağı zaman, dənizlər alovlanacağı zaman, hər kəs *öz tayına* qovuşdurulacağı zaman, diri-diri *torpağa* basdırılmış qız *uşağı* soruşulacağı zaman –hansı günaha görə öldürülmüşdür; səhifələr açılacağı zaman, göy qopardılacağı zaman, Cəhənnəm alovlandırılacağı zaman və Cənnət *möminlərə* yaxınlaşdırılacağı zaman hər kəs *bu gün üçün özünə* nə tədarük etdiyini biləcəkdir."**[42]

O gün insan qəbirdən çıxanda insanların ah-nəaləsi, fəryad səslərini eşidəcək. Kimlər deyəcək:

---

[41] Yasin, 51
[42] ət-Təkvir, 1-14

**Onlar deyəcəklər: "Vay halımıza! Bizi yatdığımız yerdən kim qaldırdı? Bu, ər-Rəhmanın vəd etdiyi *qiyamətdir*. Elçilər doğru deyirlərmiş"[43].**

Ey Allahın qulu! İnsan o gün qəbrindən çıxanda özünə fayda vermək üçün öz yaxınlarına, tanışlarına, atasına, anasına, qadın öz ərinə, valideyn öz övladına müraciət edəcək. Ana deyəcək: "Ey övladım! Səni bir müddət qarnımda daşıdım, əziyyətlərə dözdüm, sənin üçün gecələri oyaq qaldım, səni böyütmək üçün hər bir əziyyətə qatlaşdım. Bunların müqabilində heç olmasa mənə bir savab ver ki, onunla Allahın hüzuruna gedim".

O gün insanların bütün yaxınları, oğul-uşağı, qardaşı-bacısı, ata-anası və bütün əzizləri onu əli boş geri qaytarıb deyəcəklər: "Məndən uzaq ol. Mənim səndən buna daha çox ehtiyacım var". Allah Təalə bu yerdə buyurur:

**"O gün insan öz qardaşından, anasından, atasından, arvadından və övladlarından qaçacaq! O gün onlardan hər birinin yetərincə işi olacaqdır."[44]**

Ey insan! O günün dəhşətindən analar öz südəmər körpələrini atacaqlar. Amma dünyada ikən o körpəsi üçün hər şeyini qurban verərdi. Allah Təalə buyurur:

**"Ey insanlar! Rəbbinizdən qorxun! Həqiqətən, o Saatın sarsıntısı müdhiş bir şey olacaqdır. Onu görəcəyiniz gün hər bir əmzikli körpəsi olan qadın əmizdirdiyini unudacaq, hər bir hamilə qadın bətnindəkini salacaqdır. İnsanları sərxoş görəcəksən, halbuki onlar sərxoş olmayacaqlar. Allahın əzabı hədsiz şiddətlidir."[45]**

O gün insan ağlayaraq sağa-sola çevrilib, ətrafına baxacaq və bədənləri çılpaq, ayaqları yalın və O günün dəhşətindən saçları ağarmış insanları görəcək. Allah Təalə bu barədə buyurur:

---

[43] Yasin, 52

[44] Əbəsə, 34-37

[45] əl-Həcc, 1-2

**“Əgər küfr etsəniz, uşaqların saçlarının ağaracağı gündən necə yaxa qurtaracaqsınız? O gün göy parçalanacaq. Allahın vədi mütləq yerinə yetəcəkdir.”**[46]

Ey insan! O gün günahkarların gözləri zəlilcəsinə yerə dikilərək qorxudan az qala ürəkləri ağızlarına gələcək və onları gətirib bir yerə toplayacaqlar. Günəş də bir milə qədər onların başları üzərində olacaqdır. Sonra isə sorğu-sual başlayacaq. İnsanlar o gün adbaad çağırılacaq. Filankəs oğlu filankəs haradadır? Filankəs qızı filankəs haradadır? Bunu eşidəndə insanın əl-qolu əsəcək, az qalacaq ki, dizi üstə yerə çöksün.

Cəlil olan Allah Təalə belə buyuracaq: ”Aparın qulumu Cəhənnəmə”

Heç o an barəsində fikirləşdinmi? Allah Təalə buyurur:

«**O gün ki, hər kəs etdiyi yaxşı və pis əməlləri *qarşısında* hazır görəcək, özü ilə *pis əməllərinin* arasında çox böyük məsafə olmasını arzulayacaqdır. Allah sizi Özündən çəkindirir. Allah qullarına Şəfqətlidir”.** »[47]

Ey insan! o gün bütün günahlarını, valideynlərinə asi olmağını xatırlayacaqsan. O an ki, anan, atan sənə iş buyurdu: Dedin “yox”. Hamısını Qiyamət günü xatırlayacaqsan və o zaman insan günahları ilə özü arasında uzaq bir məsafə olmasını arzulayacaq. Ey insan! Həmin gün suallara cavab vermək üçün bu gün dünyada ikən nəfsini hesaba çək. Allah Təalə buyurur:

**“Ey iman gətirənlər! Allahdan qorxun! Hər kəs sabahı üçün nə etdiyinə baxsın. Allahdan qorxun! Həqiqətən, Allah nə etdiklərinizdən xəbərdardır.”**[48]

Ey Allahın qulu, ey insan! Yatmazdan əvvəl, və ya vitir namazını qılmazdan əvvəl, və ya dəstəmaz aldıqdan sonra, və yaxud da yuxu zikrlərini etdikdən sonra fikirləş gör ki, Allah üçün nə etdin. Günahlarını bir əlinə qoy, savablarını da o biri əlinə. Sonra öz nəfsini hesaba çək. Gör hansı ağır gəlir. Ey Allahın qulu! Qiyamət günü hesaba çəkməzdən əvvəl

---

[46] əl-Müzzəmmil, 17-18
[47] Ali-Imran, 30
[48] əl-Həşr, 18

öz nəfsini hesaba çək. Yoxsa Qiyamət günü gələndə Allah Təala o kimsələr barəsində buyurur:

**"*Aləmi* Çulğalayanın xəbəri sənə gəlib çatdımı? O gün *neçə-neçə* üzlər zəlil olub yerə dikiləcək, üzülüb əldən düşəcək, çox qızmar oda girəcək."**[49]

Allah Təalə başqa bir ayədə buyurur:

**"Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik!"**[50]

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) İbn Macəda rəvayət olunan bir hədisdə belə buyurur:

**"Qiyamət günü əməlləri dağlar boyda olan qövmlər, camaatlar gələcəklər. Allah Təalə onların əməllərini heç bir şey edəcək".**

Souban (*Allah ondan razı olsun)* soruşur: "Onlar kimlərdir, ya Rasulullah? Onları bizə vəsf et ki, biz onlardan olmayaq". Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) belə buyurur: *"Onlar sizin namaz qıldığınız kimi namaz qılarlar, oruc tutarlar, hətta gecə namazına da qalxarlar. Amma Allahın haramları ilə tək tənha qaldıqda bu haramlara yol verərlər, insanların gözü önündə özlərini saleh bir insan kimi aparalar. Amma özü evdə tək qalanda, otaqda tək oturanda, artıq onu heç kim görməyəndə Allaha asi olmağa başlayar, və yaxud bazara gedərkən fikirləşər ki, heç kimsə onu izləmir və nə istəyir onu da edər"*[51].

Allah Təalə buyurur:

**"Məgər o bilmir ki, Alah Təalə onu görür?"**[52]

Allah Təalə Qiyamət günü onun etdiyi əməllərin hamısını ona göstərəcək. Cəhənnəmi görəndə o insan dərindən bir ah çəkəcək və etdiyi bütün əməlləri xatırlayacaq. Necə ki, Allah Təalə buyurur:

**«"Cəhənnəm gətiriləndə, məhz o gün, insan öz günahlarını xatırlayacaq, peşman olacaq, artıq o peşmançılığı ona heç bir fayda**

[49] əl-Ğaşiyə, 1-4
[50] Furqan, 23
[51] İbn Macə
[52] əl-Əlaq, 14

**verməyəcək və O gün insan belə deyəcək: “Kaş ki, həyatımı yaxşı işlərə həsr edəydim”**.»

Elmi olan kimsə deyəcək: “Kaş ki, insanlara bu elmi çatdırardım. Kaş ki, pis əməllərdən onları çəkindirərdim, səhlənkarlıq etməyərdim”. Ey Allah yolunda dəvət edən kimsə! Sənən nə olub? Sənə Allah yoluna, Islama dəvət etməyə nə mane olur? Utanmaqmı? Allah utanılmağa daha layiqdir, yoxsa qorxumu? Allah qorxulmağa daha layiqdir. Ey insan, Allahın əmr etdiyi yerdə danışmadın. O məclisdə ki, Allaha qarşı, saleh insanlara, dinə qarşı xoşagəlməyən söhbətlər edirdilər. Amma sən o yerdə elmin, ixtiyarın olduğu halda sakit dururdun, hətta o məclisi tərk etmirdin və bu hərəktini xatırlayıb belə deyəcəksən:

**“Kaş ki, həyatımı yaxşı işlərə həsr edəydim.”**

Həmin şəxs Qiyamət günü öz günahlarına baxıb bunların səbəbkarı olan pis dostlarını xatırlayacaq.

Allah Təalə Qurani Kərimdə buyurur:

**“Həmin gün zalım kimsə barmaqlarını dişləyərək deyəcəkdir: “Kaş ki, mən Peyğəmbərin yolunu tutub gedəydim! Vay halıma! Kaş ki, filankəslə dost olmayaydım! Çünki Zikr (Quran) mənə çatdıqdan sonra o, məni ondan uzaqlaşdırdı”. Həqiqətən, şeytan insanı tənha qoyub qaçandır.”**[53]

Dünyada ikən yaxşı və pis dostlarını xatırlayacaqsan, o dostları ki, dünyada ikən səni məscidlərə, dini elm məclislərinə, xeyir yığıncaqlarına dəvət edirdilər. Amma pis insanlar, pis dostlar isə sənə belə deyirdi: “ Cavansan, beş günlük dünyadır, get kefini çək, bunlara qoşulub özünü bədbəxt etmə. Avaralanmaq yox, içki içmək yox, gəzmək yox, kef çəkmək yox. Onlar həyatını itiriblər” Şübhə yoxdur ki, bu anları sən Qiyamət günü xatırlayacaqsan. O zaman peşmançılıqdan nəinki bir barmağını, əfsuslar olsun ki, iki əlini ağzına salıb çeynəyəcəksən. Mələklər gəlib həmin şəxsi Cabbar, Qabbar və dünyaya, yerlərə, göylərə sahib olan Allah Təalənin hüzuruna aparacaqlar.

---

[53] Furqan, 27-29

Qiyamət günü sıxıcı anlar barəsində Aişə (*Allah ondan razı olsun)*dən belə rəvayət olunur: "Bir gün cəhənnəmi xatırlayıb ağladım və Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*)dan soruşdum: "Ey Allahın rəsulu Qiyamət günü bizi xatırlayacaqsanmı?" Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) buyurdu: **"Üç an vardır ki, o zaman heç kim, heç kimi xatırlamaz: Əməl dəftərləri veriləndə, hətta sağ və ya sol əlinə çatana qədər; Əməllər tərəzidə çəkilməyə başlayandan qurtarana qədər və Sirata ayaq qoyandan, hətta keçib qurtarana qədər".**[54]

Ey insan! Nəhayət sən o sıxıcı anları yaşamaq üçün, sorğu–suala çəkilməyə, Uca Allahın hüzuruna gətiriləcəksən. Allah, insanı aralarında heç bir tərcüməçi olmadan sorğuya çəkəcək. Əgər bu insan Rəbbinə itaət etməyən, zalımlardan, inadkarlardandırsa, Allah ona etdiyi günahları xatırladacaq: "Ey qulum! Mənə asi olub, günah işləməyini, sabah namazına yatıb qalmağını, insanları əyri yola yönəldib düz yoldan sapdırmağını, rüşvət almağını, oğurluq etməyini, haram faiz yeməyini xatırlayırsanmı? Dünyada ikən faizin haram olduğunu bilirdin, amma əl çəkmirdin. Bilirdin ki, öz ailənin bir günah etdiyini görəndə, zövcən və ya qızın hicabi tərk edəndə buna görə sənin üzərinə məsuliyyət düşür. Amma bir şey demirdin". O gün insan bu suallara hansı üzlə cavab verəcək?! Allah bilir. Əgər boynuna almayıb deyərsə ki, "mən deməmişəm, mən etməmişəm" onda Allah mələklərdən və onu bu iş üzərində görən insanlardan şahidlər gətirəcək. Dünyada ikən ona nəsihət edən kimsələr gəlib deyəcək: "Ya Rəbbi! Dəvət etdim, amma icabət etmədi, başa saldım, lakin təkəbbürlük edib qəbul etmədi, dünyaya olan məhəbbətinə güc gələ bilmədi, nəfsinin arzularına uydu". Bu insan əgər bu şahidləri də qəbul etməsə, onda Allahın izni ilə onun ağzına möhür vurulacaq və öz əzaları özünə qarşı şahidlik edəcək. Əlləri, ayaqları və dəriləri danışacaq.
Allah Təalə buyurur:

---

[54] Əbu Davud, Albani hədisi səhihləşdirmişdir.

**“Bu gün onların ağızlarına möhür vurarıq. Qazandıqları *günahlar* barəsində onların əlləri Bizimlə danışar, ayaqları da şəhadət verər.”**[55]
Bunları görən insan dəhşətə gələrək öz əzalarına belə xitab edəcək:

**«Onlar öz dərilərinə: “Nə üçün əleyhimizə şahidlik edirsiniz?”– deyəcəklər. *Dəriləri* deyəcək: “Hər şeyi danışdıran Allah bizi danışdırdı. Sizi ilk dəfə O yaratmışdır və siz *axırda* Ona qaytarılacaqsınız”. »**[56]

Bəli, ey insan! O gün əl şahidlik edərək deyəcək: ”Ya Rəbbi! mən verdim, mən aldım, mən götürdüm”. Ayaq deyəcək: “Mən getdim”. Dil deyəcək: “Mən danışdım”. Göz isə deyəcək: “Mən baxdım”. O gün insanın bütün əzaları danışacaq.

Sorğu-sualdan sonra onun əməl dəftəri ona soldan veriləcək. Allah Təalə Qurani Kərimdə bu barədə belə xəbər verir:

**«Kitabı sol əlinə verilən kimsə isə deyəcəkdir: “Kaş kitabım mənə verilməyəydi! Hesabımdan da xəbərim olmayaydı! Kaş ilk ölümüm həmişəlik olaydı! Var-dövlətim məni *əzabdan* qurtarmadı. Hökmranlığım da məhv olub getdi”**[57] ».

Başqa bir ayədə Allah Təalə belə buyurur:

**“ *Hər kəsin* kitabı *qarşısına* qoyulacaq və sən günahkarların orada *yazılmış* olanlardan qorxduqlarını görəcəksən. Onlar deyəcəklər: “Vay halımıza! Bu necə bir kitab imiş! O nə bir kiçik, nə də bir böyük günahı buraxmadan hamısını sayıb yazmışdır!” Onlar etdikləri əməlləri öz qarşılarında görəcəklər. Rəbbin heç kəsə haqsızlıq etməz!”**[58]

Amma indi o insan görəsən nə istəyir? Allah Təalə Səcdə surəsində buyurur:

**“Kaş ki, günahkarları öz Rəbbi qarşısında başlarını aşağı dikərək: “Ey Rəbbimiz! Biz gördük və eşitdik. Bizi geri qaytar ki, yaxşı işlər görək. Həqiqətən də, biz qəti inandıq!”– *deyəndə* görəydin!”**[59]

---

[55] Yasin, 65
[56] Fussilət, 21
[57] Əl-Həqqa, 25-29
[58] Kəhf, 49
[59] əs-Səcdə, 12

Vallahi ki, o zaman insan dünyaya qayıdıb məsciddə oturmağı, Allaha səcdə halında qovuşmağı, bircə qəpiyi olsa belə onu Allah üçün sədəqə verməyi düşünəcək. Amma artıq çox gecdir. Əgər hesaba çəkilən insan Rəbbinin hüzuruna tövbə edərək gələnlərdən olarsa, bütün günahlarını etiraf etdikdən sonra Allah Təalə ona belə deyəcək: "Dünyada ikən sənin etdiyin günahları insanlara bəyan etmədim, bildirmədim və sənin günahlarını örtdüm. Bu gün isə səni bağışlayıram". Həmin insanın kitabı isə ona sağdan veriləcək və o, başqalarının yanına gedib belə deyəcək:

**"Kitabı sağ əlinə verilən deyəcəkdir: "Budur, oxuyun kitabımı! Mən bilirdim ki, etdiklərimin hesabına qovuşacağam".**[60]

Gedib insanlara müjdələndiyini çatdıracaq və belə deyəcək: "Mənim kitabıma, səhifələrimə, gecə qıldığım namazlara, gündüz tutduğum oruclara, sədəqələrə, insanlara etdiyim yaxşılıqlara baxın". Allah bizləri həmin kimsələrdən etsin.

Qiyamət günü sıxıcı anlardan biri də hədisdə zikr olunduğu kimi əməllərin tərəzidə çəkildiyi vaxtdır. Həmin an barəsində Allah Təalə buyurur:

**"Biz Qiyamət günü üçün ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq edilməz. Hər hansı bir əməli bir xardal dənəsi ağırlığında olsa belə onu tərəziyə gətirərik. Haqq-hesab çəkməyə Biz kifayətik**."[61]

Başqa bir ayədə Allah Təalə buyurur:

**"*O gün* məhz tərəziləri ağır gələnlər nicat tapacaqlar. Tərəziləri yüngül gələnlər isə özlərini ziyana uğradanlardır. *Onlar* Cəhənnəmdə əbədi qalacaqlar."**[62]

Ey Allahın qulu! O gün insanların yaxşı və pis əməllərini tərəzidə çəkmək üçün gətirəcəklər və bu zaman insanlar üç qrupa bölünəcəklər:

---

[60] Əl-Həqqa, 19-20

[61] əl-Ənbiya, 47

[62] əl-Muminun, 102-103

1) Savabları günahlarından çox olanlar;
2) Günahları savablarından çox olanlar;
3) Savabları günahlarından çox olub, amma sahibinə fayda verməyənlər, yəni Allahın həmin şəxsin savablarını adilliklə puça döndərdiyi kimsələr.

Birinci qrup, savabları günahlarından çox olan kimsələr, möminlərdir. Allah Təalə bizləri onlardan etsin. Möminlərin əməllərini tərəzidə çəkmək üçün gətirəcəklər. Onların tövhidini, namazlarını, oruclarını, zəkatlarını, sədəqələrini və gözəl əxlaqlarını gətirib tərəziyə qoyacaqlar. Onların savabları ağır gələcək.

Sonra günahları savablarından çox olan kimsələrin əməlləri tərəzidə çəkilmək üçün gətiriləcək. Amma savabları az olduğu üçün bu onlara fayda verməyəcək. Sonra Allah tərəfindən onların Cəhənnəmə atılması üçün bir nida gələcək:

« ***“Mələklərə deyiləcək*****: “Onu yaxalayıb zəncirləyin! Sonra da Cəhənnəmə atın! Onu uzunluğu yetmiş dirsək olan zəncirə vurun”.**[63] »

Cəhənnəmə üzü qoylu süründürüləcəklər və oda yaxınlaşdırıldıqları zaman Cəhənnəmin qapıları açıq olacaq. Allah Təalə bu yerdə belə buyurur:

**“O gün Biz Cəhənnəmə: “Doldunmu?”– deyəcəyik. O isə: “Yenə varmı?”– deyəcəkdir”**[64]**.**

Üçüncü qrupdan olanlar barəsində isə Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) öz səhabələrinə belə xitab edir: *“Bilirsinizmi müflis kimdir?”* dedilər. “Ey Allahın rəsulu! İçimizdən malı-mülkü olmayanlar. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) dedi: *“Ümmətimdən müflis olan kimsə Qiyamət günü çoxlu savablarla gələr, amma dünyada ikən insanlarn haqqını tapdaladığına görə həmin insanlar gəlib öz haqqlarının əvəzinə onun savablarını götürüb gedərlər. Hətta onun savabları qurtarar. Başqa bir dəstə haqqlarının əvəzinə savab almağa görərlər ki, artıq onun savabı qalmayıb və bu zaman haqqı tapdalanmış bu insanlar öz günahlarını onun üstünə töküb*

[63] Əl-Haqqə, 30-32
[64] Qaf, 30

*gedərlər"*[65]. Ey insan! O gün dünyada ikən zülm etdiyin, döydüyün, söydüyün, böhtan atdığının, qeybətini etdiyin, malını haqsız yerə yediyin insanların hamısı səndən öz haqqlarını tələb etmək üçün gələcəklər və bunun əvəzində onlara sənin savablarından veriləcək. Savabların bitdikdən sonra onlar günahlarını sənə yükləyəcəklər və həqiqətən də sən müflislərdən olacaqsan, əlin boş qalacaq.

Allah Təalə adildir, dünyada zülm etdiyin insanların haqqlarını səndə qoyan deyil. O gün bu insan, Allahın ondan qəbul etdiyi, yaxşı əməllər yazılmış kitabına baxacaq, amma heç bir şey görməyəcək. Hamısı silinib getmişdir. Onun qıldığı namazları, tutduğu orucları və s. başqa ibadətlərin savabı haradadır? Artıq onun yaxşı əməlləri başqalarının xeyrinə oldu. Halbuki, insan onları uzun müddət əziyyət çəkib toplamışdır. Amma indi onun savabları haqqlarını tapdaladığı insanların səhifələrinə yazıldı. Öz kitabı isə başqalarının günahları ilə doldu. Bax, ey insan! Kiməsə zülm və xəyanət edənin, böhtan atanın, haqsız yerə insanların malını yeyənin, qeybət edənin müflislikdən payı var.

Allah Təalə buyurur:

**"Zalımların etdikləri əməllərdən Allahın xəbərsiz olduğunu sanma. *Allah* sadəcə onları *cəzalandırmağı* gözlərin bərələ qalacağı günə saxlayır. *O gün* onlar başlarını yuxarı qaldıraraq *carçıya doğru* tələsəcəklər. Onlar özlərinə belə dönüb baxmayacaq və onların qəlbi də bomboş qalacaqdır (qorxudan bütün başqa duyğulardan xali olacaqdır). İnsanları onlara əzab gələcəyi günlə qorxut. *O gün* zalımlar deyəcəklər: "Ey Rəbbimiz! Bizə yaxın bir vaxta qədər möhlət ver ki, sənin dəvətini qəbul edək və elçilərin arxasınca gedək". *Onlara deyiləcəkdir:* "Məgər əvvəllər siz *dünyadan köçməyəcəyiniz* barədə and içməmişdiniz?! Siz özlərinə zülm edənlərin yurdlarında sakin oldunuz. Onlara nələr etdiyimiz sizə aydın oldu və sizə misallar da çəkdik". *Zalımlar* öz hiylələrini qururdular. Halbuki onların hiyləsi Allaha bəlli idi. Onların hiyləsi ilə dağlar yerindən tərpənən deyildir. Allahın Öz elçilərinə verdiyi vədə xilaf çıxacağını sanma. Həqiqətən, Allah Qüdrətlidir, intiqam**

[65] Müslim

**almağa qadirdir. O gün yer başqa bir yerlə, göylər də *başqa göylərlə* əvəz olunacaq *və insanlar* Tək olan, *hər şeyə* Qalib gələn Allahın hüzurunda duracaqlar. O gün günahkarları zəncirlənmiş görəcəksən. Onların paltarları qatrandan olacaq, üzlərini də alov bürüyəcəkdir. Allah hər kəsə qazandığının əvəzini vermək üçün *belə edəcəkdir*. Həqiqətən, Allah tez haqq-hesab çəkəndir"[66].**

Ey Allahın qulu! Qiyamət günü ən çətin anlardan sonuncusu sirat körpüsündən keçməyin çətinliyidir. İnsanlar Qiyamət günü bu mərhələlərdən keçdikdən sonra sirat körpüsünə tərəf yönələcəklər. Əbu Səid əl-Xudri (*Allah ondan razı olsun)*nin rəvayətinə görə, "**Bu körpü Cəhənnəm üzərində Cənnətə keçmək üçün salınmışdır. Özü də tükdən nazik, qılıncdan itidir"[67].**

Kim dünyada ikən Allahın buyurduqlarına əməl edib, qadağan etdiklərindən çəkinmişdirsə Allahın köməkliyi ilə bu körpünün üzərindən keçəcəkdir. Kimlər ki, dünyada öz Rəbbinə asi olaraq günahları çox olub, tövbə etmədən Allahın hüzuruna gələrsə körpünü salamat başa vurmaq onlara nəsib olmayacaq və körpünün üzərindən Cəhənnəmə düşəcəklər.

Ey Allahın qulu! Siratın üzərindən keçərkən yaşanacaq qorxulu anları qəlbində canlandır və fikirləş ki, artıq sirat körpüsünün üzərindəsən və Cəhənnəm də ayağının altında alovlanır. Oraya düşən insanların ah-naləsinin səsi gəlir və Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) də körpünün yanında durub keçənlər üçün belə dua edir:

"Ey Rəbbim, sən onları salamat saxla".

İnsanlardan bəziləri siratdan külək kimi yüngül, bəziləri qaçan at kimi, bəziləri sürünərək keçəcək və digər bir qismi də yıxılaraq Cəhənnəmə düşəcəklər.

Ey insan! Heç Cəhənnəmin vəsfi barədə eşitdinmi? Ey Allahın qulu! Səhih qaynaqlardan toplanmış Cəhənnəmin vəsfinə qulaq as:

Cəhənnəm - Allahın kafirlərə, zalimlərə, Allahın əmrlərinə qarşı gələnlər üçün hazırladığı bir məskəndir. Odu çox şiddətli, qamçıları

---

[66] İbrahim, 42-51

[67] Müslim

dəmirdir. Cəhənnəmin dibi, atılan daşın yetmiş ildən sonra ora çatacaq məsafəsi qədər dərindir. Qiyamət günü Cəhənnəmi sürüyüb gətirəndə Cəhənnəmin yetmiş min qulpu olacaq və hər bir qulpundan yetmiş min mələk tutacaq. Cəhənnəm odu dünya odundan yetmiş dəfə artıq yandırır. Orada insanlara əzab vermək üçün böyük ilanlar və əqrəblər var. Onlardan biri kafiri sancanda kafir zəhərin ağrısını qırx ilə kimi çəkər. Cəhənnəm əhlinin paltarı od, yeməkləri zəqqum, içkiləri isə qaynar və qanlı irinli sudan başqa bir şey deyil. Zəqqum Cəhənnəmin ortasında bitən bir ağacdır. Meyvəsi çox acı, iyi çox pis, şəkli isə çox iyrəncdir. Əgər zəqqumun bir damcısı bu dünyaya düşsəydi, dünya əhalisinin həyatını korlayardı. Gör onu yeyənin vəziyyəti necə olar?! Cəhənnəm əhli ondan qarınlarını doyuzdurana qədər yeyər, sonra isə üstündən qaynar su içərlər. Daha sonra isə onları orada dəmir qamçılarla vurarlar. Zərbənin şiddətindən əzaların hərəsi bir yerə düşər. Sonra yenidən birləşib, əzaba məruz qalarlar. Sonra onların əllərini boyunlarına dəmir halqalarla, saçlarını isə çəkib arxadan ayaqlarına bağlayarlar və beləcə onlar Cəhənnəm odunu üzləri ilə qarşılayarlar, əlləri ilə üzlərini yandıran odu dəf edə bilməzlər. Allah bizləri Cəhənnəm əzabından qorusun! Həmin zaman Cəhənnəm əhli Cəhənnəmə düşməkdə pis dostlarını təqsirləndirərlər.

Necəki Allah Təalə buyurur:

«*Allah* **deyəcək: "Sizdən əvvəl gəlib-getmiş** ***günahkar*** **cin və insan tayfaları ilə birlikdə Oda girin!" Hər tayfa** ***Oda*** **girdikcə havadarlarını lənətləyəcəkdir. Nəhayət, hamısı orada toplandığı zaman sonrakılar əvvəlkilər barəsində deyəcəklər: "Ey Rəbbimiz! Bunlardır bizi azdıran! Elə isə Odda bunlara ikiqat əzab ver!"**[68]»

Dünyada ikən öz nəfslərinə uyub, şeytanın vəsvəsələri ilə oturub duran, Allahın insanlara doğru yol göstərdiyi halda Allahın əmrlərini tərk edən, şeytanın insana zərər verdiyi halda ona tabe olan, özlərini şeytanın əsgərinə çevirən kimsələrə, şeytanın heç bir köməyi çatmayacaq və bu zaman onlar peşman olacaqlar, amma bu peşmançılıq onlara fayda

---

[68] əl-Əraf, 37

verməyəcək. Bununla belə Cəhənnəmə düşdükləri üçün pis dostlarını qınadıqları kimi, şeytanı da qınayacaqlar.

Allah Təalə bu barədə Quarni Kərimdə buyurur:

**"İş bitdikdə şeytan deyəcək: "Həqiqətən də, Allah sizə gerçək vəd vermişdi. Mən də sizə vəd vermişdim, lakin *vədimə* xilaf çıxdım. Mənim sizin üstünüzdə heç bir hökmranlığım yox idi. Mən sizi *azğınlığa* dəvət etdim, siz də *dəvətimi* qəbul etdiniz. Buna görə də məni yox, özünüzü qınayın. Nə mən sizin köməyinizə çata bilərəm, nə də siz mənim köməyimə çata bilərsiniz. Heç şübhəsiz ki, mən əvvəllər də sizin məni *Allaha* şərik qoşmağınızı rədd etmişdim". Həqiqətən, zalımlar üçün üzücü bir əzab hazırlanmışdır"** [69] **.** Sonra onlar Cənnət əhlinə belə müraciət edəcəklər. Allah Təalə buyurur:

«**Od sakinləri Cənnət əhlini səsləyib deyəcəklər: "Bizim üstümüzə bir az su və ya Allahın sizə verdiyi ruzidən tökün". Onlar isə deyəcəklər: "Allah bunları kafirlərə haram etmişdir"**[70]»**.**

Onlar qəlbi daşdan da sərt olan Cəhənnəm mələyinə belə deyərlər: "Allaha dua et ki, əzabımızı heç olmasa bircə gün belə yüngülləşdirsin. Onlar deyəcəklər: "Məgər, sizə öz Peyğəmbəriniz açıq– aşkar möcüzələr göstərmədimi?" Onlar: "Bəli" deyə cavab verərlər. Bu zaman onlara deyərlər: "Elə isə özünüz dua edin!" Kafirlərin duası isə boş şeydir, heç vaxt qəbul olunmaz. Onlar Cəhənnəm mələyinə deyərlər: "Ey Malik! Rəbbin bizim üçün ölüm hökmü kəssin və öldürsün ki, bu əzabı görməyək". Cəhənnəm mələyi olan Malik isə onlara yalnız bir cavabla kifayətlənərək: "Siz orada qalacaqsınız" deyəcək. Sonra onlar Allaha dua edəcəklər: "Ey Rəbbimiz! Bizi buradan çıxart. Əgər bir də günahlara qayıtsaq biz zalimlərdən olarıq". Allah Təalə onlara belə deyəcək: "Orada qalın və məni dindirməyin". Bunu eşidəndə onlar hər şeydən ümidlərini kəsəcəklər. Allah bizləri Cəhənnəm əzabından qorusun.

Müsəlman bacı və qardaşlar! Kimə sirat körpüsünün üzərindən keçib Cənnətə girmək nəsib olarsa o, artıq nicata çatmışdır. Allah Təalə öz

---

[69] İbrahim, 22

[70] Əl-Əraf, 50

saleh qulları üçün orada gözlərin görmədiyi, qulaqların eşitmədiyi, xəyallara gəlməyəcək şəkildə nemətlər hazırlamışdır. Hər bir möminin Cənnətdə hurilərindən iki zövcəsi olacaq. Əgər onlardan biri dünya əhlinə görsənsəydi, Günəşin işığını batırıb bütün dünyanı işıqlandırar, gözəl qoxusu yerlə göylərin arasını doldurardı. Cənnətdə bir qırmanc qədər kiçik bir yer, dünya və onun içində olan hər bir şeydən daha xeyirlidir. Cənnət əhlinə verilən ən böyük nemət isə Allah Təaləni görməkdir. Necə ki, onlar Allah Təaləni görəndə onlara bəxş olunmuş bütün nemətləri unudaraq ona baxacaqlar. Necə ki, Allah Təalə buyurur:

**"O gün *neçə-neçə* üzlər nurlanacaq və öz Rəbbinə baxacaqdır."**[71]

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*)in əshabələri belə anları ölümü və dəhşətini, qəbri və zülmətini, Qiyaməti və onun şiddətini, sorğu-sualın çətinliyini, əməl dəftərinin açılmasını, əməllərin çəkilməsini, siratı, Cənnəti və Cəhənnəmi fikirləşəndə... necə ki, Allah Təalə onlar barəsində Qurani Kərimdə xəbər verir:

**"Onlar *gecə namazını qılmaq üçün* böyürlərini yataqdan qaldırır, qorxu və ümid içində öz Rəbbinə yalvarır və onlara verdiyimiz ruzilərdən *Allah yolunda* xərcləyirlər."**[72]

Necə ki, sələfilərdən olan Mələ bin Zeyyadın belə dediyi rəvayət edilir:

"Cəhənnəmdən qorxan adamın halına təəccüb edirəm. Ondan qorxan, ondan qaçan adam necə yata bilər. Cənnəti istəyən adamın halına təəccüb edirəm. Onu tələb edən, onu istəyən adam necə yatar bilər, necə onun gözünə yuxu gedə bilər."[73]

Onlar Allahın əzabını, ölümü, Allah qarşısında durmağı, Qiyamət günü qəbirlərdən çıxıb haqq hesab üçün məhşərə toplanacağını fikirləşəndə gecələr yata bilmirdilər, gecələrini Allaha ibadətdə keçirərdilər. Çətin də olsa çoxlu savab qazanmağa çalışırdılar.

Nəyə görə? Ona görə ki, Allah Təalədən qorxurdular və Onun rəhmətini istəyirdilər. Allah Təalə buyurur:

---

[71] əl-Qiyamət, 22-23

[72] əs-Səcdə, 16

[73] İbn Rəcəb, "Təxvif minən nar"

**“Heç bilənlərlə, bilməyənlər eyni olarmı?”**[74]

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) İbn Məsuddan onun üçün Quran oxumasını xahiş edir. İbn Məsud (*Allah ondan razı olsun)* deyir: “Ya Rəsulullah! Quran sənə endiyi halda mən sənin üçün Quranmı oxuyum?” Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) deyir: *“Oxu, mən onu başqasından dinləməyi çox sevirəm”*. İbn Məsud (*Allah ondan razı olsun)* oxumağa başladı. Oxudu, hətta Nisa surəsindəki bu ayəyə çatanda **“Biz hər ümmətdən bir şahid gətirəcəyimiz və səni də onlara şahid gətirəcəyimiz zaman *onların halı* necə olacaq?”**[75] Ibni Məsud (*Allah ondan razı olsun)* deyir: “Baxdım gördüm ki, Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) ağlayır"[76].

Başqa bir rəvayətdə Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) gecə namazına qalxar. İsa peyğəmbərin dilindən hekayət olunan ayəni- “**Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!”**[77] bütöv gecəni təkrarlayaraq “ümmətim, ümmətim” deyib ağlayardı[78].

Əbu Bəkr (*Allah ondan razı olsun)* Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) dən sonra ən xeyirli insandır. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) xəstə olduğu zaman zövcəsi Aişə(*Allah ondan razı olsun)* yə belə əmr edərdi: *“Əbu Bəkrə de ki, camaata namaz qıldırsın”*. Aişə (*Allah ondan razı olsun)* deyir: “Ya Rəsuləllah! Əbu Bəkr kövrək insandır. Namazda dözüb dayana bilmir, çox ağlayır. Hətta Fatihə surəsini oxuyanda belə ağlayır”[79].

Başqa bir rəvayətdə Əbu Bəkr (*Allah ondan razı olsun)* bir gün ənsarlardan birinin bağına girərkən orada uçan bir quş görüb, dizi üstə yerə çökərək ağlayır. Ondan soruşduqda sənə nə olub ey Əbu Bəkr? O, belə cavab verir: “Quşa baxdım, ağacların üzərindən uçur və bağın

[74] əz-Zumər, 9
[75] ən-Nisa, 41
[76] Müslim
[77] Əl-Maidə, 118
[78] Müslim
[79] Buxari

meyvəsindən yeyir. Sonra isə ölüb gedir. Nə hesab var, nə də əməl. Kaş ki, bir quş olaydım"[80].

Ömər (*Allah ondan razı olsun)* barəsində belə rəvayət olunur ki, bir gün namazda bu ayəni oxudu: «**..."Mən dərd-qəmimi yalnız Allaha açıb söyləyirəm və Allahdan *nazil olan vəhy sayəsində* sizin bilmədiklərinizdən agah oluram."**»[81] və ağlamağa başladı, hətta arxasındakıları da ağlatdı[82]. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*)in əshabələrinin halı belə idi.

Tabiinlərdən olan Həsənul–Bəsri (*Allah ona rəhmət etsin*) çox ağlayardı. Ondan bunun səbəbini soruşduqda o, belə cavab verərdi: "Qorxuram ki, Allah Sübhanəhu Təalə məni oda atsın və bir daha yadına salmasın"[83].

Sələfilərdən olan Ali ibni Fudeyl (*Allah ona rəhmət etsin*) barəsində belə rəvayət olunub ki, o gecə namazında ikən bu ayəni **"Odun üzərində dayandırıldıqları vaxt onların: "Kaş ki, bizi *dünyaya* qaytaraydılar! Onda biz Rəbbimizin ayələrini yalan saymayıb möminlərdən olardıq"– dediklərini görəydin!"** [84] oxuyurdu. Huşunu itirdi, bir daha özünə qayıtmadı və bu ayəni tamamlaya bilmədi. Ayənin əzəməti onun ölümünə səbəb oldu.

Onlar vacib olan beş namaz xaricində nafilə və gecə namazları qılardılar. Əgər onlar əlavə namazlarda bu hissləri keçirərdilərsə, fikirləşin vacib namazlarda onların halı necə olardı?! Təəssüflər olsun ki, bir çox özlərinə müsəlman adı verən kimsələr isə Allahın onlara vacib etdiyi beş namazı tərk ediblər. Fikirləşin, bu ikisinin arasında nə qədər böyük fərq var. Kimləri Allahın əmrlərini lazımınca yerinə yetirməyə çalışır və Allahın onların əməllərini qəbul etməməsindən qorxur və ağlayır, kimləri isə ibadətdən uzaq düşdüyü halda qəlbini Allahın rəhməti ilə doldurub "Allah Kərimdir" deyir.

---

[80] İmam əl-Beyhəqi "Şüabul Iman"
[81] Yusuf, 86
[82] İbni Qayyum "Mənaqibil Ömər"
[83] İbni Qayyum "Cəvabul Kəfi"
[84] əl-Ənam, 27

Ola bilsin ki, yuxarıdakı rəvayətdə mübaləğə, ziyadə var, amma biz bütün müsəlmanların belə halda olmasını heç bir kimsəyə icbar etmirik. İstəyirik ki, heç olmasa insan Allahın vacib etdiyi əmrləri yerinə yetirsinlər (namaz, oruc və s.). Allahın vacib etdiyi haqqları versin, Qurani Kərimi eşidəndə təsirlənsinlər.

Ömər ibn AbdulAziz (*Allah ona rəhmət etsin*) gecə namazına qalxıb ağlayardı və arxasında onun əhli də ağlayardı. Səhər olanda ondan soruşardılar: "Allah sənə rəhm etsin, Səni ağladan nədir, ey Ömər?" O, belə cavab verərdi: "Gecə ikən Allah Təalənin bu kəlamını "**Bir dəstə Cənnətə ayrılacaq, bir dəstə Cəhənnəmə"**[85] oxuyurdum və fikirləşirdim ki, mən onların hansı birindən olacağam? Mən Cənnətə gedən firqədənəm, yoxsa Cəhənnəmə?"

Zövcəsi Fatimə (*Allah ona rəhmət etsin*)dən onun barəsində soruşduqda belə deyərdi: "Ömər ibn AbdulAziz yatağından qalxanda qorxu içərisində dik atılardı və qalxıb namaz qılardı, ağlayardı. Onu görəndə deyərdin ki, eləbil indi onun ruhu çıxacaq və beləcə fəcr azanına qədər davam edərdi. Sonra isə qalxıb namaza gedərdi. Allah Təalə buyurur:

**"Məgər onlar Quran haqqında düşünmürlərmi? Yoxsa qəlbləri qıfıllıdır?"**[86]

Əli (*Allah ondan razı olsun)* bir gün qəbirləri ziyarət edəndə belə deyir:

"Ey müsəlmanlardan və möminlərdən ibarət olan ev əhli! Allahın salamı sizin üzərinizə olsun və biz də İnşaAllah sizə yetişəcəyik". Sonra isə belə deyir: "Ey qəbirstanlıq əhli! Sizdən sonra evlərinizdə məskən qurdular, mallarınızı böldülər, yoldaşlarınız başqalarına ərə getdi. Budur bizim halımız. Bəs sizin halınız nədir?" Bir az oturduqdan sonra belə dedi: "Əgər danışa bilsəydilər belə deyərdilər: «Özünüzə bu dünyadan azuqə götürün, azuqələrin ən xeyirlisi isə təqvadır»".

Təqva isə Allah Təalənin qadağan etdiklərindən çəkinmək, əmr etdiklərini yerinə yetirmək, əzabından qorxmaq, rəhmətini ummaq və Allahın əzabı ilə öz aranda bir maneə yaratmaqdır.

---

[85] əş-Şura, 7

[86] Muhamməd, 24

Ey müsəlman bəndə! Sənin neçə-neçə yoldaşların, dostların var idi ki, onlar artıq bu dünyadan ayrılıblar. Bir gün həmin növbə gəlib sənə də çatacaq və o, gün onlar sənə heç bir şey fayda verməyəcəkdir. Saleh əməllərindən başqa. Necə ki, sələfi salehlərdən biri olan Harun Rəşid ölüm ayağında ikən ətrafındakılara belə deyir: "Məni basdırılacağım qəbrə aparın". Onu qəbrin yanına aparırlar. Qəbri görəndə ağlamağa başlayır və bu iki ayəni «**Var-dövlətim məni *əzabdan* qurtarmadı. Hökmranlığım da məhv olub getdi".** »[87] oxuyur, sonra başını yuxarı qaldırıb belə deyir: "Ey əbədi olub, mülkü yox olamayan Xaliq! mülkü fani olan məxluqlara rəhm et!"

Bax, ey Allahın qulu! İnsanı ölümündən heç nə qurtara bilməz. Mal, pullar, böyük tikdiyin imarətlər, sultanlar, dünyadakı hörmət, izzət, vəzifə, şan şöhrət haradadır? O gün saleh əməllərdən başqa heç bir şey insana fayda veməyəcək. Hamımız öləcəyik, amma ölüm ilə iş qurtarmır. Ölümdən sonra qəbir həyatı var, sonra Qiyamət günü dirilmək. Sonra isə məliklərin məliki olan Allah Təalənin qarşısında cavab vermək var.

Ey Allahın qulu! Günahlarının böyüklüyü, çoxluğu səni Allahın rəhmətindən ümüdsüz etməsin. Əsası, öndə olan şeylərə görə Allahdan qorx. Allahın buyurduğu kimi yaşa ki, arxada qoyduğun günahlara görə Allah səni bağışlasın.

Günahlar nə qədər böyük və çox olsa da insan Allaha səmimi tövbə edəndə Allah onu bağışlayır.

Allah Təalə belə buyurur:

**"O kəslər ki, bir pis iş gördükdə, yaxud özlərinə zülm etdikdə Allahı xatırlayıb günahlarının bağışlanmasını diləyərlər, – günahları Allahdan başqa kim bağışlaya bilər? – onlar bilə-bilə etdiklərinə görə israr etməzlər".** *(Ali-İmran, 135)*

Ey Allahın qulu! Allah, səmimi tövbə etdikdə bütün günahları bağışlayır. Amma Allah Təalə yuxarıdakı ayədə şərt qoyur:

**" Onlar bilə-bilə etdiklərinə görə israr etməzlər."**

---

[87] əl-Həqqa, 28-29

Ey insan! Bu məsələləri bildikdən sonra kiçik günahlar üzərində, yad qadına baxmaqla, musiqiyə qulaq asmaqla, sabah namazına yatıb qalmaqla, qeybət etməklə və digər günahlar da edirsən ki, onları Allahdan başqa heç kəs bilmir. Çünki etdiyin günaha bir daha qayıtmamaq tövbənin şərtlərindən bir şərtdir.

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) belə buyurur: *"Əgər bir insan bir günah edərsə, sonra qalxıb, dəstəmaz alıb iki rükət namaz qılarsa və bu namazda öz nəfsi ilə danışmazsa* (yəni huşu ilə oxuduğu ayətləri düşünə-düşünə, dərk edə-edə namaz qılarsa) *Allah Təalə onun günahlarını bağışlayar"*[88].

Allah Təalə Qurani Kərimdə buyurur:

**"Ancaq tövbə edib iman gətirən və saleh əməllər edənlərdən başqa. Allah onların pis əməllərini yaxşı əməllərlə əvəz edər. Allah Bağışlayandır, Rəhmlidir!"**[89]

Əgər tövbə etmək istəsən elə indi, eşidən dəqiqədən əzm et ki, bütün günahlardan qayıdıb tövbə edəcəksən.

Demə ki, İnşaallah Ramazan gələndə, həccə gedəndə, evlənəndən sonra və ya bu vəzifədən çıxdıqdan sonra tövbə edərəm. Ölümü özündən uzaq görmə, onu müəyyən xəstəlik və qocalıq kimi səbələrə bağlama, sağlamlığına güvənmə. Əgər tövbəni sonraya saxlasan, sən bu yerdə böyük xəta etmiş olarsan. Niyə? Çünki əcəlin gec gələcəyinə ümüd edirsən. Bu isə ən böyək xətadır, bunun da özünün tövbəyə ehtiyacı var.

Ey Allahın qulu! Allah Təaləyə tövbə etməyə, ona qayıtmağa tələs. Allah Təalə qulu ona tövbə edəndə çox sevinir. Allahın quluna olan rəhməti, ananın övladına olan rəhmətindən daha böyükdür. Amma övlad həddini aşanda ana onu cəzalandırdığı kimi, Allah da bəndələri həddini aşanda öz hikməti və ədaləti ilə onlara cəza verir. Allah qullarına haqsız yerə əsla zülm etməz. Əgər insanların etdikləri günahlara görə Allah həmin anda onları cəzalandırsaydı, yer üzərində insan qalmazdı. Amma Allah qullarına tövbə edib, ona qayıtması üçün möhlət verir.

---

[88] Muslim

[89] Furqan, 70

Allahummə! Bizləri Cənnətinə və Cənnətinə yaxınlaşdıran bütün əməllərə müvəffəq elə və bizləri əzabından və əzabına yaxınlaşdıran bütün şər əməllərdən qoru!

Allahummə! Sən bizim Rəbbimizsən, Səndən başqa ibadətə və itaətə layiq heç kimsə yoxdur. Bizləri sən yaratdın və bizlər sənin qullarınıq, sənə verdiyimiz əhdi və vədi gücümüz çatan qədər yerinə yetirməyə çalışırıq. Sənin bizlərə olan nemətini və günahlarımızı sənin qarşında etiraf edirik. Bizləri bağışla. Günahları bağışlayan ancaq sənsən.

Sübhənallah! Allahdan daha rəhimli kim var?! Allah Təalədən bizim günahlarımızın bağışlanmasını diləyirik.

*Onu da qeyd edək ki, əlinizdəki kitab daima Uca Allaha möhtac olan insan əməyinin bəhrəsidir və buna görə də orada xətaların olması labüddür. Hər hansı bir xəta ilə üzləşdikdə və ya mövzu ilə bağlı daha maraqlı təklifiniz olarsa elman_medine@hotmail.com elektron ünvanına yazmanızı xahiş edirik.*

**"İman və Təqva"** dərsinin elektron və səsli variantını əldə etmək üçün www.feqih.com –a müraciət edə bilərsiniz.